*© "Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.109-120* *e-ISSN 2617-751X*

**UOT:** 2.28
**KBT:** 86.38
**MJ №** 157

# Heydər Əliyev irsində İslam dini gənclərin milli-mənəvi, mədəni-psixoloji bütövlüyünün amili kimi

**Adilə Nəzərova***

**Abstrakt.** Azərbaycan Respublikasında yaşayan, İslam dininə etiqad edən azərbaycanlılar müsəlman aləminin tərkib hissəsidir. Ölkəmiz müstəqillik qazanandan sonra öz milli, mədəni, dini ənənələrini bərpa və inkişaf etdirmişdir. Bu dəyərlərimizin möhkəmlənməsi sahəsində uğurlarımızda ulu öndər Heydər Əliyevin böyük xidmətləri danılmazdır. Onun apardığı siyasət və tövsiyyələri nəticəsində gənclərimiz öz milli köklərinə, mənəvi dəyərlərinə sadiqdir. Azərbaycan gənclərinin həyatda uğur qazanması, sülh və əmin-amanlıq içində yaşaması üçün bunlar önəmli amillərdir. Həmçinin, ümumbəşəri, dünyəvi dəyərlərdən səmərəli şəkildə istifadə etmək, onları milli-mənəvi, dini dəyərlərimizlə birləşdirmək və bütövlükdə xalqımızın mənəviyyatını zənginləşdirmək Heydər Əliyev siyasətinin əsas istiqamətlərindən biri olmuşdur. Onun bu yolda əsas məqsədi tolerantlığın və milli mədəniyyətimizin, dini dəyərlərimizin Azərbaycan gənclərinə düzgün şəkildə təbliğ edilməsi olmuşdur. Belə ki, Azərbaycan xalqı İslam sivilizasiyasına mənsub olmaqla yanaşı, özündə ümumbəşəri, tolerant və multikultural dəyərləri də yaşadır. Demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu yolunu tutan və bu istiqamətində işıqlı gələcəyə doğru inamla addımlayan Azərbaycan İslam dünyasında özünəməxsusluğu ilə seçilir. Ümummilli lider milli-mənəvi dəyərlərin qorunması, gənc nəslə aşılanmasına xüsusi diqqət yetirir və bunları layiqincə həyata keçirirdi.

Dövrün bəlasına çevrilən narkomaniya, cinayətkarlıq, əxlaqsızlıq, həyatdan bezginlik, mənəvi və ruhi düşkünlük kimi halların qarşısını almaq üçün İslam dininin tədris və təbliği son dərəcə önəmlidir. Hazırda Azərbaycanda bu sahədə görülən işlər özünü Heydər Əliyev siyasətinin

* Filologiya üzrə fəlsəfə doktoru,
Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: adile1970@mail.ru
https://orcid.org/0000-0002-4340-6882

**Məqaləyə istinad:** Nəzərova, A. [2023]. Heydər Əliyev irsində İslam dini gənclərin milli-mənəvi, mədəni-psixoloji bütövlüyünün amili kimi. *"Metafizika" jurnalı, 6(1),* səh.109-120.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 12.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 14.02.2023*
*Çapa qəbul edilmişdir: 14.03.2023*

davamı olaraq göstərir. İman və inamın xilası, kamil, sağlam əxlaqlı, cəsur, həqiqətpərəst, ədalətli gənclərin yetişdirilməsi İslamın düzgün öyrədilməsindən asılıdır ki, Heydər Əliyev öz hakimiyyəti illərində buna çalışmış və müəyyən qədər nail olmuşdu.

**Açar sözlər:** Azərbaycan gəncliyi, milli-mənəvi dəyərlər, İslam dini, multikultural dəyərlər, Heydər Əliyev siyasəti, İslam Kolleci, mədəni-psixoloji bütövlük

## 1.Giriş

Azərbaycan dili, tarixi, ədəbiyyatı, mədəni-mənəvi, dini dəyərləri ümummilli lider Heydər Əliyevin azərbaycançılıq fəlsəfəsinin, Müstəqil Azərbaycan Respublikasının milli və dövlət ideologiyasının əsasını təşkil edir.

Sovet rejiminin milli birliyini dağıtdığı dünya türkləri dini inancı, bu inancı qoruyub saxlayan ənənələri, xüsusilə də ədəbiyyatı sayəsində məhv olmaqdan qurtarmışdır. Heydər Əliyevə görə türkləri birləşdirmək üçün onları ortaq düşüncə ətrafında toplamaq ideyasını- dini dəyərləri ortaya qoymaq lazım idi. Onun Azərbaycanın klassik ədəbiyyatına, klassik ədəbiyyatın nümayəndələrinin əsərlərinin təbliğinə xüsusi diqqət və qayğısının böyük təzahürünü də bununla əlaqələndirmək olar. Məşhur filosof Bəhmənyarın, mütəfəkkir şair Nizami Gəncəvinin, astronom-riyaziyyatçı Nəsirəddin Tusinin və dahi Məhəmməd Füzulinin, orta əsrlərin böyük alimi Rəşidəddinin, üsyankar hürufi şairi Nəsiminin, görkəmli tarixçi Abbasqulu ağa Bakıxanovun, realist yazıçı Mirzə Fətəli Axundovun, satirik yazararlardan Mirzə Ələkbər Sabirin, Cəlil Məmmədquluzadənin, XX əsr klassiklərimiz Üzeyir Hacıbəyovun, Hüseyn Cavidin və Azərbaycan xalqının milli dirçəlişində, dini inancında rolu olan seçilmişlərin irsini yüksək dəyərləndirmiş, onların tədris və təbliğinə daha çox yer ayırmağı tövsiyyə etmiş, Azərbaycan gənclərinin qəlbində onların əbədi abidəsini ucaltmışdır.

Prezident İlham Əliyev tərəfindən "İslam həmrəyliyi" ilə bağlı çağırışı hələ ulu öndər Heydər Əliyevin hakimiyyəti illərində irəli sürdüyü "İslam birliyi" ideyasının məntiqi davamı kimi dəyərləndirmək yerinə düşər. Belə ki, Heydər Əliyev 1993-cü ilin 10 oktyabrında Azərbaycan Respublikasının Prezidenti seçilərkən, andiçmə mərasimindəki nitqində İslam dininə münasibətini açıq şəkildə ifadə etmişdir. O, Azərbaycan Konstitusiyası ilə bərabər "Quran"a da and içmiş və öz çıxışında milli-mənəvi, mədəni-əxlaqi dəyərlərimizin gələcək nəslə ötürülməsində İslam dininin rolunu özəlliklə qeyd etmişdir: "Xalqımızın mənəviyyatına, elminə, qüdrətinə, zəkasına İslam dininin böyük təsiri olmuşdur. Milli ənənələrimiz, mədəniyyətimiz bir çox

hallarda İslam dini vasitəsilə nəsildən-nəslə keçib, indi böyük milli sərvətimiz kimi bugünkü nəsillərə çatmışdır. Azərbaycanda İslam dininə insanların sərbəst etiqad etməsi üçün bütün şərait yaradılmış və bundan sonra da yaradılacaqdır. Güman edirik ki, bizim dinimiz respublikanın bu ağır dövründə vətəndaş həmrəyliyinin, vətəndaş birliyinin yaranması üçün çox böyük fəaliyyət göstərəcəkdir” [1].

**2.Heydər Əliyev irsində İslam dini Azərbaycan gəncliyinin milli-mənəvi dəyərlərinin tərkib hissəsi kimi**

İslam dini Azərbaycan xalqının önəmli və zəngin milli-mənəvi dəyərlərindən biridir. Sovet dövründə bu dəyər bir qədər üstüörtülü həyata keçirilirdisə, müstəqillik illərində bu, daha geniş şəkildə ortaya çıxdı.

Heydər Əliyev bütün sahələrdə olduğu kimi, dini məsələlərin də nəzəri cəhətlərini yaxşı bilir və onu ən doğru yolla həyata keçirirdi.

Heydər Əliyev irsində İslam dini gənclərin milli-mənəvi, dini-əxlaqi dəyərlərinin tərkib hissəsi kimi ortaya çıxır. Ümummilli lider dini dəyərlərimizin qorunması ilə bağlı dəfələrlə bəyanatlar vermiş, qanunlar və sərəncamlar imzalamışdır. O, gənc nəslin daha sağlam psixologiyada, saf əxlaq tərbiyəsində inkişafını dövlət siyasətinin qarşısında duran ən zəruri vəzifələrdən biri hesab etmişdir. *“Hər xalqın öz adət-ənənəsi var, öz milli-mənəvi və dini dəyərləri var. Biz öz milli-mənəvi dəyərlərimizlə, öz dini dəyərlərimizlə, adət-ənənələrimizlə fəxr edirik. Bizim xalqımız yüz illərlə, min illərlə adət-ənənələrimizi, milli-mənəvi dəyərlərimizi yaradıbdır və bunlar indi bizim xalqımızın mənəviyyatını təşkil edən amillərdir”* (H.Əliyevin 13 avqust 2001-ci il tarixli bəyanatı) [3, s.4].

Heydər Əliyev bir dövlət xadimi kimi dini məsələlərdə olduqca həssaslıq göstərirdi, keçirilən tədbir və mərasimlərin tamaşaçısından çox fəal iştirakçısı olurdu və onun bu özəllikləri cəmiyyətin, əsasən də gənclərin həyat yolunun istiqamətlərini müəyyənləşdirirdi. O, bununla İslam dininin müasir Azərbaycan cəmiyyətində tutduğu yeri göstərir, gənclərin yad ideoloji cərəyanlardan, qeyri-ənənəvi missioner təşkilatların pozucu fəaliyyətindən uzaqlaşdırır, onların gələcəkdə törədə biləcəkləri təxribatlarının qarşısını almaq məqsədilə müasirlik və din, dövlət və din münasibətlərinin sağlam müstəvidə qurulması yolunda önəmli addımlar atırdı. Qeyd edirdi ki, islam dini milli-mənəvi cəhətdən sağlam cəmiyyətin qaynağıdır, cəmiyyətin əsas sütununu isə sağlam fikirli gənclər təşkil edir.

Heydər Əliyev ayrı-ayrı etnosları, konfessiyaları və mədəniyyətləri təmsil edən Azərbaycan tolerantığını möhkəmləndirməklə həmrəylik naminə, ənənəvi və qeyri-ənənəvi dinlər arasında münasibətləri qanun çərçivəsində sivil yolla tənzimləyirdi. O, dini ekstremizmə qarşı mübarizədə təhsillə

yanaşı dini maariflәndirmәnin rolunu da әsas götürürdü. Müstәqil Azәrbaycan Gәnclәrinin I forumundakı (1996-cı il, 2 fevral) çıxışında ayrı-ayrı qrupların gәnclәrә fanatizm әhval-ruhiyyәsi aşılamaq istәyini vә bunların da gәnclәrimizn tәrbiyәsinә zәrәr vurduğunu qeyd etmişdir.

Mәhz Heydәr Әliyevin uzaqgörәn siyasәti sayәsindә Azәrbaycanda bu sahәdә böyük dönüş yarandı vә dövlәt-din münasibәtlәri mahiyyәt etibarilә yeni müstәvidә qurularaq bir çox ölkәlәr üçün nümunә sayıldı. Belә ki, vicdan vә dini etiqad azadlığı tәmin olunmuşdu. Bu, sovet dövründә dağıdılmış mәscidlәrin bәrpasında, yeni mәscidlәrin tikilmәsindә olduğu qәdәr dini tәhsil verәn mәdrәsәlәrin dә fәaliyyәtinә icazә verilmәsilә özünü göstәrirdi. Dünyәvi elmlәrlә yanaşı dini tәhsil verәn mәdrәsәlәrin fәaliyyәti ölkәmizdә İslamın möhkәmlәndirilmәsindә böyük rol oynadı. Heydәr Әliyevin hakimiyyәti illәrindәn başlayaraq açılan mәdrәsәlәr vә bir neçә il öncәyәdәk respublikamızın bir sıra rayonlarında, o cümlәdәn, Cәlilabad, Masallı, Ağdaş, Göyçay, Şәki vә paytaxt Bakıda öz fәaliyyәtini davam etdirmişdir.

Qeyd edәk ki, 2017-ci ildәn ölkәmizdә İslam mәdrәsәlәrinin sayı artaraq 20-yә çatmış, Heydәr Әliyevin tәşәbbüsü ilә 2001-ci ildә Azәrbaycanda din siyasәtinin hәyata keçirilmәsi mәqsәdilә yaradılan Azәrbaycan Respublikası Dini Qurumlarla İş üzrә Dövlәt Komitәsi tәrәfindәn kollec statusu ilә rәsmi dövlәt qeydiyyatına alınmış vә fәaliyyәti genişlәndirilmişdir. Azәrbaycanın müxtәlif bölgәlәrindә dini icmaların tәrkibindә fәaliyyәt göstәrәn kurslarla yanaşı İslam dininin elmi әsaslarla öyrәnilmәsi üçün açılan bu dini tәhsil müәssisәlәrindә işlәyәn müәllimlәr yerli kadrlardan seçilmiş, tariximiz, milli mәdәniyyәtimiz, soy-kökümüz haqqında biliklәr verilmәklә, mәzhәblәrarası tolerant münasibәtlәr, multikultural әlaqәlәr tәdris vә tәbliğ olunur, "İslam birliyi" prinsiplәrinin sistemli şәkildә tәlәbәlәrә öyrәdilmәsi nәzәrdә tutulur. Kolleclәrdә dinin tәdrisi prosesindә dinin tәmәlindә dayanan әsas biliklәrin öyrәdilmәsi tәlәbәlәrin dinlә bağlı dolğun vә düzgün tәfәkkürә sahib olmasına imkan yaradır. Әks halda kollec tәlәbәlәrinin natamam dini biliklәrinin boş qalan yeri antimilli qüvvәlәr, dini radikalizmin tәrәfdarları tәrәfindәn mәqsәdli şәkildә doldurulacaqdı.

Bunlar Zaqatala İslam Kolleci, Gәncә İslam Kolleci, Lәnkәran İslam Kolleci, Quba İslam Kolleci, Heydәr İslam Kolleci, Nardaran İslam Kolleci, Bibiheybәt İslam Kolleci, Şәki (hafizlik) İslam Kolleci, Әliabad İslam Kolleci, Şәbnәm (qızlar) İslam Kollecidir. Bu kolleclәrin fәaliyyәti nәticәsindә ölkәmizin milli-dini kadrların hazırlanması istiqamәtindә irәlilәyişlәrә nail olunacağı gözlәnilir [4].

Bu da gəncləri dini fanatizmdən, zərərli vərdişlərdən və əxlaqi-tərbiyəvi hərəkətlərin pozulmasından qoruyur. Bu fikirləri ümumiləşdirərək demək olar ki, Azərbaycan dövləti dini sahədəki bu uğurları İslam həmrəyliyinin əsasını qoyan Heydər Əliyevin azərbaycançılıq siyasəti nəticəsində əldə etmişdir.

Ölkəmizdə din və dövlət münasibətləri dünyəvilik prinsipinə əsaslanır. Bu modeli ulu öndər belə ifadə edirdi: “Bizim dövlətimiz dünyəvi dövlətdir. Ancaq biz dindən ayrı deyilik”. Heydər Əliyevin dünyəvilik modeli din-dövlət münasibətlərinin bir-birindən ayrı olmasına baxmayaraq, dini dəyərlərin də təməl dəyərlərimiz kimi qorunan və davamlı istifadə olunan modeldir.

Gənclər bilməlidirlər ki, həyatda uğurla yaşamaq üçün xalqımızın, millətimizin milli-mənəvı dəyərlərınə sadiq olmaq lazımdır, bu milli-mənəvi dəyərləri ümumbəşərı dəyərlərlə birləşdirib müasir həyat tərzi keçirmək lazımdır [7].

**3.Heydər Əliyev irsində İslam dini gənclərin mədəni-psixoloji bütövlüyünün amili kimi**

Heydər Əliyev bütün fəaliyyəti dövründə İslam mədəniyyətinin Azərbaycanın bir ölkə kimi inkişafında rolunu yüksək qiymətləndirir və çıxışlarında İslam dininin ümumbəşəri əhəmiyyətini xüsusi olaraq vurğulayırdı. O, həmçinin, dünyada fəaliyyət göstərən bir çox tədqiqat mərkəzlərində İslam dinini fundamentalizm və ekstremizm olaraq təqdim edənlərə etiraz etmiş, onların bu sahədə fikirlərini inkar etmişdir. Heydər Əliyev Bakıda keçirilən *“İslam sivilizasiyası Qafqazda”* adlı Beynəlxalq Simpoziumda açılış mərasimindəki çıxışında mövzu ilə bağlı fikirlərini belə ifadə etmişdir: “Biz İslam mədəniyyətinin Azərbaycan xalqı üçün əvəzsiz olduğunu qeyd edərək, eyni zamanda, dini, yaxud milli məhdudiyyət yaradan fikirləri, meyilləri və ya təklifləri qəbul etmirik. Millilik, islamilik, ümumbəşəri dəyərlərin sintezi ilə xalqı inkişaf etdirə bilər. İndi dünyadakı bəzi mərkəzlərdə *“İslam fundamentalizmi, İslam ekstremizmi, fanatizmi” haqqında da fikirlər söylənilir”.*

Gənclərin həyatında dini inancın, dini əqidənin müəyyən qədər rol oynadığına əmin olan Heydər Əliyev İslamın müqəddəs kitabı “Quran”da fundamentalizm və ekstremizm “axtaran”ların səylərini, İslam dininin bəzi prinsiplərini təhrif etməyə çalışanların fəaliyyətlərini haqsızlıq hesab edirdi. Onları ayrıseçkilik yaradan, İslam həmrəyliyini pozan qüvvələr adlandırırdı. O, hesab edirdi ki, həmin təxribatçılar İslamın əsas prinsiplərindən uzaqdırlar və onlar gəncləri də müəyyən qədər öz milli, dini dəyərlərindən uzaqlaşdırırlar.

Ümummilli lider İslam dinini cəmiyyətdə humanist prinsiplərin çarçısı, sülhün və əmin-amanlığın, qardaşlığın dini olduğunu dəfələrlə qeyd edirdi. Hər dəfə bu mövzuda çıxış edərkən, narahatlıqlarını da dilə gətirirdi. O, bildirirdi ki, bəzi terror qruplarının öz cinayətkar əməllərini həyata keçirmək üçün fəaliyyətlərini dini şüarlarla pərdələməyə çalışırlar və bu yolverilməzdir.

Heydər Əliyevi bir şəxsiyyət, bir dövlət xadimi və bir prezident kimi fərqləndirən milli köklərinə və dini dəyərlərinə bağlılığı idi ki, o, bu keyfiyyətləri ilə həmişə öndə olmuşdur. Tarix boyu milli-mənəvi, dini-əxlaqi dəyərlərimizin sıradan çıxarılmasına çalışan sovet hakimiyyətinin süqutundan sonra, xalqımız öz dəyərlərinin bərpasına başladı. Xalq ana dilinin inkişafına, milli mədəniyyətin, dini dəyərlərin, əxlaq normalarının yüksəldilməsinə, gənclərin milli ruhda tərbiyə edilməsinə Heydər Əliyevin uğurlu siyasəti nəticəsində nail oldu.

Onun gənclərlə görüşünün hər biri, hər nitqi xitab etdiyi nəslin vətənpərvərlik ruhunda geniş üfüqlər açırdı.

*“Bu gün böyük iftixar hissi ilə deyə bilərik ki, Azərbaycanın qüdrətli ordusu vardır. Azərbaycan torpaqlarını həmişə müdafiə etməyə, lazım olarsa, torpaqlarımızı müharibə yolu ilə azad etməyə qadir olan ordumuz vardır. Azərbaycanda cəmiyyətdə, xüsusilə gənclər arasında orduya münasibət müsbət mənada tamamilə dəyişibdir. Gənclər indi orduya həvəslə gedirlər, orduda xidmət edirlər, öz vətəndaşlıq borclarını yerinə yetirirlər və Azərbaycan ordusunu gücləndirirlər, inkişaf etdirirlər. …Ordunun bugünkü vəziyyəti hamımızda böyük iftixar hissi doğurur. Bəli, qısa bir zamanda Azərbaycanda ordunun yaranması və orduda zabitlərin, əsgərlərin sədaqətlə xidmət etməsi həyatımızın ən gözəl əlamətlərindən biridir. Ancaq orduya qayğı, diqqət daim artmalıdır. Azərbaycan gəncləri orduda xidmət etməyi öz şərəfli borcları hesab etməlidirlər”* [4].

Heydər Əliyevin, sonrakı illərdə də Prezident İlham Əliyevin məqsədyönlü fəaliyyəti nəticəsində ölkəmiz müasirliklə- tolerantlıq və multikultiralizmlə yanaşı İslam dini ilə bağlı maarifləndirmə işlərini də davam etdirmişdir. Bu müdrik siyasətin nəticəsi idi ki, gənclərimiz Azərbaycanın bütövlüyü, sərhədlərimizin qorunması yolunda döyüşə həvəslə getdilər. Gənclər siyasətində milli maraqların və dövlətçilik maraqlarının öndə olması 44 günlük II Qarabağ savaşında həlledici rol oynadı, Azərbaycan gəncliyinin mübarizliyi, təşəbbüskarlığı ilə əsgər və zabitlərimiz misilsiz şücaət göstərərək xalqımıza zəfər qazandırdılar. Onlar bu yolda vətən sevgisi ilə bərabər dini inanclarını rəhbər tutdular və *“Vətəni sevmək imandandır”* (Məhəmməd Peyğəmbər), *“Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək”*

(M.Füzuli, “Hədiqətüs-süəda”) şüarları altında şəhidliyə ucaldılar. Bu, eyni zamanda, onların dini inanclarının, mədəni-psixoloji bütövlüyünün göstəricisi idi.

**4.Heydər Əliyev irsində müasirlik və dini-mənəvi dəyərlər**

“Məlumdur ki, biz 70 il kommunist ideologiyası ilə tərbiyələnərək dinimizdən və dinin bizə bəxş etdiyi mənəvi dəyərlərdən məhrum olmuşuq. Kommunist ideologiyasının bəşəriyyətə vurduğu zərbələrdən ən böyüyü 70 il ərzində dinə qarşı aparılmış təbliğat, xüsusən dinin qadağan olunması və təhrif edilməsi olmuşdur”. Bu fikirlər Heydər Əliyevin 1998-ci ildə (1-2 oktyabr) Bakıda təşkil olunan “Müasirlik və dini-mənəvi dəyərlər” adlı Beynəlxalq konfransdakı çıxışındandır. Heydər Əliyev ölkədə rəhbərliyə başlayandan sonadək bütün çıxışlarında Sovet dövründə xalqın İslam dinindən məcburən və qəsdən uzaqlaşdırılmasını, bu vaxt xalqın keçirdiyi mənəvi sarsıntıları xatırladırdı. Burada məqsəd insanların bu psixoloji narahatlıqdan qurtarmasını yada salmaq və bunların bir daha təkrar olunmamasını gənc nəslin şüuruna təlqin etmək idi. O, həmişə qeyd edirdi ki, Sovet hakimyyəti dövründə İslam dininə qarşı aparılan total və ardıcıl mübarizə təkcə Azərbaycana qarşı yox, bütün İslam ölkələrinə, nəticə etibarilə İslam dininə qarşı idi.

Heydər Əliyev deyirdi:

*“İslam dini başqa dinlərə qarşı heç vaxt düşmən olmamışdır. Çünki bu dinlərin hamısı Allahdan gəlir. Azərbaycanda da müsəlmanlarla yanaşı başqa dinlərə etiqad edən adamlar da yaşayır. Onlar da Azərbaycanın bərabərhüquqlu vətəndaşlarıdır. Çalışmalıyıq ki, dini, milli mənsubiyyətindən asılı olmayaraq Azərbaycanın bütün vətəndaşları eyni hüquqlu olsunlar və onların hamısının birliyini, vəhdətini təşkil edək. Bu da Allah-Taalanın buyuruğu, bizim yolumuzdur”* [6].

Ulu öndərin Azərbaycanda bütün sahələrdə göstərdiyi saysız xidmətləri var, onun elm və təhsilin inkişafında, milli ideologiyanın formalaşmasında, dini-mənəvi dəyərlərin qorunmasında misilsiz fəaliyyət yolları var ki, o yollar bu gün də davam etdirilir.

O, həm SSRİ dövründə, həm də Müstəqillik dövründə İslam ölkələrinə səfərlərində bu ölkələrin bir-birinə xoş münasibətini, İslam təəssübkeşliyini, İslam həmrəyliyini mənimsəməyi formalaşdırırdı. Heydər Əliyev İslam dünyasında həm də bu ideyalarla siyasət yürütdüyü üçün tanınırdı və sayılırdı.

Heydər Əliyevin dini-mənəvi dəyərlərimizi əks etdirən müdrik kəlamları İlahiyyat üzrə fəlsəfə doktoru Ceyhun Məmmədovun ideya müəllifliyi,

Azərbaycan İlahiyyat İnstitutunun Elmi Şurasının qərarı ilə 21 dildə nəşr olunmuşdur. Bu kəlamlardan bir neçəsini diqqətə çatdırmaq yerinə düşər.

- "Qurani-Şərif"in bizə verdiyi tövsiyələr, göstərdiyi yollar paklığa, düzlüyə, doğruluğa, sədaqətə, qəhrəmanlığa, cəsarətə, cəsurluğa dəvət edən tələblərdir, tövsiyələrdir.
- Dinindən, dilindən, irqindən asılı olmayaraq, Azərbaycanın bütün vətəndaşları eyni hüquqlara malikdirlər və bu hüquqlar qorunmalıdır!
- Heç vaxt inamımızdan, dinimizdən uzaqlaşmayacağıq və bu mənəvi mənbələrimizdən istifadə edərək gələcəyimizi quracağıq!
- İnsanların mənəvi sərvətlərinin hamısından dinin fərqi ondadır ki, o, dini mənsubiyyətindən asılı olmayaraq, həmişə insanları dostluğa, həmrəyliyə, birliyə dəvət etmişdir.
- Milli azadlığa nail olmaq üçün milli oyanış, milli dirçəliş, milli ruhun canlanması lazımdır.
- Biz öz tarixi köklərimizlə, milli köklərimizlə, mənəvi dəyərlərimizlə, milli-mənəvi ənənələrimizlə, böyük tariximizlə fəxr edə bilərik.
- Mədəniyyət bəşəriyyətin topladığı ən yaxşı nümunələrlə xalqları zənginləşdirir.
- Gənclərimiz tariximizi, dilimizi, mədəniyyətimizi və dini dəyərlərimizi yaxşı bilməlidirlər [2, s.3-5].

**5.Nəticə**

Qeyd etmək lazımdır ki, bu gün Azərbaycan Respublikası islam aləmində sülhün və həmrəyliyin möhkəmləndirilməsinə böyük töhfələr verir və bu müsəlman aləmində yüksək qiymətləndirilir. Ölkəmizdə milli-mədəni dəyərlərə hörmət edən gənclərin, İslam əxlaqına malik şəxsiyyətlərin yetişməsi mənəvi varlığmızın bayağı mədəniyyətlər içərisində assimilyasiya olunmasının qarşısının alınmasıdır. Çünki Şərq və Qərb mədəniyyətləri arasında körpü olan Azərbaycan bütün dinlər və sivilizasiyalararası əlaqələrin möhkəmlənməsinə, dünyada sülhün və harmoniyanın bərqərar olmasına çalışır, bəşəriyyətə unikal birgəyaşayış və nümunəvi multikulturalizm modeli təqdim edir. Bu da onu göstərir ki, Azərbaycan islam dininin yüksək mənəvi-əxlaqi prinsiplərinə sadiq qalmaqla, ümumbəşəri dəyərlərə də önəm verir və bununla yer üzündəki bütün ölkələrin, o cümlədən din xadimlərinin üzərinə böyük məsuliyyət qoyur.

Azərbaycan tarixən tolerantlıq, qeyri dinin daşıyıcılarının dini ənənə və qaydalarına, dini mərasimlərinə sayqısı ilə fərqlənmişdir.

Demək olar ki, həm dini dəyərlərimizin möhkəmləndirilməsi, həm də beynəlxalq standartlara uyğun olan tolerantlıq Azərbaycanda ən çox ulu öndərin hakimiyyəti illərində və onun xidmətləri sayəsində yaranmışdır.

## ƏDƏBİYYAT

**1.** Azərbaycan Respublikasının Prezidenti Heydər Əlirza oğlu Əliyevin Andiçmə mərasimində nitqi Bakı - "Respublika" sarayı, 10 oktyabr 1993-cü il
https://lib.aliyevheritage.org/az/66679364.html
**2.** Heydər Əliyevin kəlamları, 21 dildə, Bakı-2019, “Mütərcim” Nəşriyyat-Poliqrafiya Mərkəzi
https://ait.edu.az/site/assets/files/1293/heydar_eliyevin_kelemleri-1.pdf
**3.** Hüseynov, S. (2009). Xalq qəzeti, 9 dekabr, s.4
**4.** (Respublika gənclərinin II forumunda Azərbaycan Prezidenti Heydər Əliyevin nitqi - 4 mart 1999-cu il) https://lib.aliyevheritage.org/az/1570012.html
**5.** http://multikulturalizm.gov.az/az/post/1129/azerbaycanda-islam.html
**6.** Ömərov, V. (2014). *Ulu öndər Heydər Əliyevin dinə, islam dininə və dəyərlərinə qayğısı dövlətçiliyin təzahürü kimi*. “Səs qəzeti”, 17 iyun
https://sesqazeti.az/news/mia/415598.html
**7.** http://shirvan.cls.az/front/files/libraries/2474/books/117810196.pdf

# Исламская религия как фактор национально-духовной и культурно-психологической целостности молодежи в наследии Гейдара Алиева

**Адила Назарова***

**Абстракт.** Азербайджанцы, проживающие в Азербайджанской Республике и исповедующие Ислам, являются частью мусульманского мира. После обретения независимости наша страна восстановила и развила свои национальные, культурные и религиозные традиции. В наших успехах в деле укрепления этих ценностей неоспоримы великие заслуги великого лидера Гейдара Алиева. Благодаря его политике и наставлениям наша молодежь верна своим национальным корням и

* Доктор философии по филологии,
Ведущий научный сотрудник Института образования Азербайджанской Республики; Баку Азербайджан
E-mail: adile1970@mail.ru
https://orcid.org/0000-0002-4340-6882

**Цитировать статью:** Назарова, А. [2023]. Исламская религия как фактор национально-духовной и культурно-психологической целостности молодежи в наследии Гейдара Алиева. *Журнал «Metafizika», 6(1),* с.109-120.

**История статьи:**
*Статья поступила в редакцию: 12.01.2023*
*Отправлена на доработку: 14.02.2023*
*Принята для печати: 14.03.2023*

нравственным ценностям. Такие факторы важны для обретения азербайджанской молодежью успеха, а также мира и спокойствия.

Эффективное использование общечеловеческих, мирских ценностей, соединение их с нашими национально-духовными, религиозными ценностями и целостное обогащение нравственности нашего народа составляло основное направление общей политики Гейдара Алиева. Соответствующее пропагандирование толерантности, национальный культуры и религиозных ценностей среди молодежи Азербайджана было его главной целью на этом пути. Таким образом, азербайджанский народ, помимо принадлежности к исламской цивилизации, сохраняет по сей день общечеловеческие, толерантные и поликультурные ценности. Азербайджан, соблюдая путь демократического, правового и светского государственного строительства и отличаясь своим своеобразием в исламском мире уверенно продвигается в светлое будущее. Сам общенациональный лидер особо обращал внимание на защиту национальных и нравственных ценностей и перенятию их подрастающему поколению и воплошал их в жизнь.

В целях предотвращения наркомании, преступности, безнравственности, безразличия к жизни, нравственной и духовной праздности, ставших бичом времени на данном этапе чрезвычайно важны преподавание и пропаганда Ислама.

Деятельность в этой области в Азербайджане в настоящее время выступает как продолжение политики Гейдара Алиева. Спасение веры и убеждений, воспитание совершенной, здоровой, нравственной, смелой, правдолюбивой и справедливой молодежи зависит от правильного преподавания Ислама, все того, чего старался достичь и в какой-то мере достиг Гейдар Алиев в годы своего правления.

**Ключевые слова:** азербайджанская молодежь, национально-духовные ценности, исламская религия, мультикультуральные ценности, политика Гейдара Алиева, Исламский Колледж, культурно-психологическая целостность

*"Metafizika" Journal*
***2023, vol 6, issue 1, serial 21, pp.109-120***

# In the legacy of Heydar Aliyev, Islam as a factor of national-spiritual, cultural-psychological integrity of young people

**Adila Nazarova***

**Abstract.** Azerbaijanis living in the Republic of Azerbaijan and practicing Islam are part of the Muslim world. After gaining independence, our country restored and developed our national-cultural and religious traditions. The great services of the great leader Heydar Aliyev are undeniable in our successes in the field of strengthening these values. As a result of his policies and recommendations, our young people are loyal to their national roots and moral values. These are important factors for Azerbaijani youth to succeed in life and live in peace and tranquility. Also, one of the main directions of Heydar Aliyev's policy was to effectively use universal, worldly values, to combine them with our national-spiritual, religious values and to enrich the spirituality of our people as a whole. His main goal in this way was to properly promote tolerance, our national culture and religious values to the youth of Azerbaijan. Thus, the people of Azerbaijan, besides belonging to the Islamic civilization, also live universal, tolerant and multicultural values. Azerbaijan, which takes the path of democratic, legal and secular state-building and steps confidently towards a bright future in this direction, stands out in the Islamic world for its uniqueness. All this, the preservation of national and moral values, instilling them in the young generation was of special importance, which the National leader duly performed.

In order to prevent drug addiction, criminality, immorality, boredom, and moral and spiritual laziness, which have become the scourge of the times, the teaching and propagation of Islam is extremely important, and the work being done in this field in Azerbaijan is a continuation of Heydar Aliyev's policy. The salvation of faith and beliefs, the education of perfect, healthy moral, brave, truth-loving, and fair young people depends on the correct teaching of the Islamic religion, which Heydar Aliyev tried and achieved to some extent during his time in power.

* Doctor of Philosophy in Philology,
Leading researcher of the Institute of Education of Azerbaijan Republic; Baku Azerbaijan
E-mail: adile1970@mail.ru
https://orcid.org/0000-0002-4340-6882

**To cite this article:** Nazarova, A. [2023]. In the legacy of Heydar Aliyev, Islam as a factor of national-spiritual, cultural-psychological integrity of young people. *"Metafizika" journal, 6(1)*, pp.109-120.

**Article history:**
*Received: 12.01.2023*
*Accepted: 14.03.2023*

**Keywords*:*** Azerbaijani youth, national-spiritual values, Islamic religion, multicultural values, Heydar Aliyev's policy, Islamic College, cultural-psychological integrity

## REFERENCES

**1.** Speech of the President of the Republic of Azerbaijan Heydar Alirza oglu Aliyev at the swearing-in ceremony, Baku - "Respublika" palace, October 10, 1993
https://lib.aliyevheritage.org/az/66679364.html
**2.** Sayings of Heydar Aliyev, in 21 languages, Baku - 2019, "Mutercim" Publishing and Printing Center
https://ait.edu.az/site/assets/files/1293/heydar_eliyevin_kelemleri-1.pdf
**3.** Huseynov, S. (2009). Khalq newspaper. December 9, p.4
**4.** (Speech of the President of Azerbaijan Heydar Aliyev at the II forum of the youth of the republic - March 4, 1999)
https://lib.aliyevheritage.org/az/1570012.html
**5.** http://multikulturalizm.gov.az/az/post/1129/azerbaycanda-islam.html
**6.** Omarov, V. (2014). *Great Leader Heydar Aliyev's concern for religion, Islamic religion and values as a manifestation of statehood*. "Ses newspaper", June 17.
https://sesqazeti.az/news/mia/415598.html
**7.** http://shirvan.cls.az/front/files/libraries/2474/books/117810196.pdf